**Kitabın adı:** Peyğəmbərin himayədarı və İslamın ağsaqqalı Əbu Talib

**Müəllif:** Muhəmməd Cavad Xəlil

**Tərcüməçi**: Ramil Aslanlı

**Dizayn:** Xəlil Məmmədov

Bağışlayan və mehriban Allahın adı ilə

Bu kitab "Əhli-sünnə hədislərinin müzakirəsi" sərlövhəsində hazırladığım tədqiqat və araşdırmaların bir hissəsidir. Müəyyən səbəblərdən bəzi tədqiqatların müstəqil surətdə çap olunmasını istədim. Bu kitabda mövcud olan tədqiqatlar qeyd olunan araşdırmaların üçüncü hissəsidir. Bu kitabı "Peyğəmbərin himayədarı və İslamın ağsaqqalı Əbu Talib" adlandırdım. Allah-taaladan bu silsilə tədqiqatları nəşr etdirməkdə bizi müvəffəq etməsini diləyirəm.

*Muhəmməd Cavad Xəlil*

# Mündəricat

## Peyğəmbərin himayədarı və İslamın ağsaqqalı Əbu Talib

Doğrudan da, İslamın böyük şəxsiyyəti mövlamız Əbu Talibin (əleyhissalam) düşməncəsinə haqsız hücumlara məruz qalması təəssüf doğuran haldır. Bəzi xain qələmlər oğlu İmam Əlinin (əleyhissalam) müqəddəsliyinə xələl gətirmək məqsədilə birbaşa olmayan bu yolu seçmişlər.

Allah bilir qiyamət günü ədalətin hakim olduğu ilahi məhkəmədə Peyğəmbər (s), Əbu Talib və İmam Əli (ə) qarşısında həmin düşmənlərin sorğu-sualı nə qədər uzun çəkəcək!

Əlbəttə, Əbu Talib tək olan Allah-taalaya iman gətirmiş, İslam Peyğəmbərini təsdiqləmiş, müşriklərin fəaliyyətləri qarşısında münasib bildiyi ən üstün üslubla Peyğəmbəri (s) himayə və müdafiə etmiş, onların Peyğəmbərə qarşı hazırladıqları mənfur planlarını puça çıxarmışdır.

İmam Cəfər Sadiqin (ə) belə buyurduğu nəql olunur: **“Əbu Talibin məsəli Əshabi-Kəhf məsəli kimidir. Onlar imanı gizlədib şirki izhar (aşkar) etmişdilər. Allah onlara iki qat mükafat verdi”.** [1]

Bu hədis Əshabi-Kəhfin mövqeyi ilə Əbu Talibin (əleyhissalam) mövqeyi arasındakı oxşarlığı qeyd edir. Bu oxşar cəhət bəzi vaxtlarda, bəzi hallarda və bəzi insanlardan etiqadı gizli saxlamaqdır. Bu, Əbu Talibin mövqeyi ilə Əshabi-Kəhfin mövqeyi arasındakı oxşar cəhətdir. Lakin yalnız bir cəhətdən. Yəni, ikinci cəhətdən (şirki izhar etmək) deyil, yalnız etiqadı gizlətmək cəhətindən oxşardır. Çünki sübuta yetirilmişdir ki, movlamız Əbu Talib (əleyhissalam) bir göz qırpımı olsun belə Allaha şərik qoşmamış və Əshabi-Kəhfin həyatlarını qorumaq üçün zahirdə özlərini müşrik kimi təqdim etdikləri kimi bir an olsun belə şirk izhar etməmişdir. Əbu Talib (ə) Həzrət Rəsulullahı (səlləllahu aleyhi və alihi və səlləm) müdafə etmək və qorumaq üçün xüsusi üslub seçmişdi. O, aşkarcasına imanını bildirmirdi. Məsələn, Məscidul-hərəmdə Peyğəmbərin (səlləllahu aleyhi və alihi və səlləm) arxasında dayanıb namaz qılmırdı.

---

[1] Şeyx Kuleyni, əl-Kafi, c. 1, səh. 373, “kitabul-huccə”, bab: “movlidun-nəbi və vəfatuhu”, hədis №28.

Çünki yaxşı bilirdi ki, belə edərsə daha əhəmiyyətli fürsətləri əldən vermiş olacaq. O, ehtiyatla və diplomatiya ilə imanını izhar edir, müşriklərə qarşı aşkar silahla savaşa girmirdi. Onun nəzərində münasib şəraitin olmasını Peyğəmbər (səlləllahu aleyhi və alihi və səlləm) və səhabələrinin güclənməsini, müsəlmanların sayının artmasını gözləmək böyük əhəmiyyət daşıyırdı. Elə məhz buna görə də Allah-taala həzrət Əbu Talibin mükafatını iki dəfə və iki qat olaraq vermişdir:

1. Möhkəm sarsılmaz imanına görə.
2. Fövqəladə vəziyyətdə zəka və məntiqə əsaslanan mövqe nümayiş etdirdiyinə görə.

Əziz oxucu, bu kitabda sənə həzrət Əbu Talibin (əleyhisalam) həyatından tarixi məlumatları və onun Muhəmməd peyğəmbərə (səlləllahu aleyhi və alihi və səlləm) iman gətirməsini sübuta yetirən dəlilləri təqdim edəcəyik. Əbu Talibin (əleyhissalam) imanını sübuta yetirəcək dəlillər çoxdur, lakin biz həmin dəlillərin bəzilərini qeyd edirik.

## BİRİNCİ DƏLİL
## ƏBU TALİBİN XÜTBƏSİ

Əbu Talib Bəni-Haşim və Məzər qəbiləsinin əyanları ilə birlikdə Həzrət Peyğəmbərlə (səlləllahu aleyhi və alihi və səlləm) xanım Xədicə binti Xuveylidin nikah məclisində iştirak edərkən xütbə söyləyərək belə demişdir:

**“Bizi İbrahimin züriyyətindən, İsmailin kökündən, Məzər nəslindən, evinin (Kəbənin) himayəçiləri, hərəminin qəyyumları qərar verdiyi, bizə qorunan evi (Kəbəni) və əmin-amanlıq olan hərəmini lütf etdiyi və bizi insanlara hakim seçdiyi üçün Allaha həmd olsun!**

**Qardaşım oğlu Muhəmməd bin Abdullah (səlləllahu aleyhi və alihi və səlləm) yaxşılıqda, fəzilətdə, səxavətdə, şərəfdə və alicənablıqda Qüreyşin hər hansı bir kişisi ilə müqayisə edilərsə, ondan üstün olar. Baxmayaraq ki, var-dövləti azdır. Var-dövlət kölgə kimi zəvala uğrayan və maniədir. O, Xədicə binti Xüveylidi**

**müəyyən miqdar mənim malımdan mehriyə olaraq nişanlamışdır. Allaha and olsun ki, onun əzəmətli xəbəri və böyük məqamı olacaq”.**[2]

Bəthanın şeyxi Əbu Talib nikah xütbəsi əsnasında Muhəmməd peyğəmbərin (səlləllahu aleyhi və alihi və səlləm) besətindən (peyğəmbərliyindən) öncə gələcəyi barədə camaata xəbər verir. Əbu Talibin xütbəsində dediyi sözlər barədə düşünərkən onun imanının dərəcəsi, təfəkkürünün səviyyəsi aydın olur. Onun qəlbi imanla dolu, tovhidlə abad və ən yüksək mərtəbədədir.

## İKİNCİ DƏLİL
## ƏBU TALİBİN ŞEİRLƏRİ

Əbu Talibin söylədiyi çoxlu şeirlər vardır. Bu şeirlər onun tək olan Allaha və Muhəmməd peyğəmbərə (səlləllahu aleyhi və alihi və səlləm) iman gətirdiyini aşkarcasına bəyan edir. Bu şeirlərin Əbu Talibə mənsub olması sübuta yetirilmiş, tarix və hədis kitablarında qeyd olunmuşdur. Həmin şeirlərdən bəzi beytləri (məzmun tərcüməsini) qeyd edirik:

**Birinci:** Həbəş kralı Nəcaşiyə yazdığı məktuba onu hicrət edən müsəlmanlara hörmətlə yanaşmağa, onları müdafiə etməyə və müşriklərin hücumundan qorumağa səsləyir. Həmin məktubda yazır:

*İnsanların ən xeyirlisi bilsin ki, həqiqətən də Muhəmməd*
*Musa və  Məryəm oğlu Məsih üçün vəzirdir.*[3]

***

*Onlar kimi bizə hidayət (doğru yol)  gətirmiş*
*Hamısı Allahın əmrilə hidayət edir və qorunur.*

***

*Siz kitabınızda onun barəsində oxumusunuz*

[2] əl-Əbşeyhi,  “əl-Mustətrif fi kulli fənnin mustəzrif”, c. 2, səh. 249. (“Daru ihyait-turasil-ərəbi”, Beyrut.)
[3] Bəlkə də “Musa və Məryəm oğlu Məsih kimi peyğəmbərdir” olması daha doğrudur.

*Doğru danışmasını, o, boş danışan deyil.*[4]

**İkinci:**

*Bilmirsinizmi biz Muhəmmədi peyğəmbər kimi tanıdıq?*
*Musa kimi kitabların əvvəlində yazılıb.*

***

*Bəndələr içərisində onun üçün elə məhəbbət var ki,*
*Allahın məhəbbətlə seçdiyi kəsdə haqsızlıq olmaz.*[5]

**Üçüncü:** Peyğəmbərə (səlləllahu aleyhi və alihi və səlləm) xitab edərək demişir:

*Allaha and olsun onlar bu cəm olmaları ilə sənə toxuna bilməzər*
*Ta ki, mən torpaq altında yatanadək.*

***

*Sənə əmr olunanı et, sənin nöqsanın yoxdur*
*Sən (dinini) təqdim elə, qoy gözlər aydın olsun*

***

*Məni dəvət etdin, bildim ki, mənə nəsihət etdin*
*Sən dəvət etdin və sən doğru danışan idin.*

***

*Bildim ki, Muhəmmədin dini həqiqətən*
*İnsanlara göndərilmiş ən xeyirli dindir.*[6]

Sələbi yazdığı təfsir kitabında nəql edərək demişdir: "Muqatil, Abdullah bin Abbas, Qəsəm bin Məhzərə və Əta bin Dinar bu beytlərin Əbu Talibə mənsub olması barədə nəql olunan rəvayətlərin səhih olmasında müttəfiqidirlər".

**Dördüncü:**

*Bilmirsiniz ki, övladımız bizim nəzərimizdə yalançı deyil*
*Biz heç batil sözləri qəbul etmərik.*[7]

**Beşinci:**

*Allah hörmətli edib Muhəmməd peyğəmbəri,*

---

[4] Hakim Nişapuri, "əl-Mustədrək aləs-səhiheyn", c. 2, səh. 623. ("Darul-mərifə", Beyrut).
[5] "Sirətu İbn Hişam", c. 1, səh. 289. (Qahirə).
[6] "Tarixu Əbulfida", c. 1, səh. 120; İbn Həcər, "əl-İsabə fi təmyizis-səhabə", c. 7, səh. 198, tərcümeyi-hal: 10175.
[7] Əmini, "əl-Ğədir", c. 7, səh. 339.

*İnsanlar içərisində Allahın ən hörmətli məxluqu Əhməddir*

***

*Onu böyük tutmaq üçün Öz adından ona ad vermiş*

*Ərşin sahibi Mahmuddur, bu isə Muhəmməd.*[8]

**Altıncı:**

Səhih Buxaridə yazılıb:

*"Əbdürrəhman bin Abdullah bin Dinar atasının belə dediyini nəql edir: "İbn Öməri Əbu Talibin şeirini deyərkən eşitdim:*

*Buludlar onun üzünün nuruna yağış yağdırır*

*Yetimlərin fəryadına çatan, dul qadınların pənahıdır.*

*Ömər bin Həmzə Salimdən, o da atasından belə dediyini nəql edir: "Şairin bu sözlərini xatırlayarkən Peyğəmbərin (səlləllahu aleyhi və alihi və səlləm) üzünə baxırdım. O, yağış yağmasını istəyirdi. O qədər yağış yağırdı ki, bütün novlar daşırdı.*

*Buludlar onun üzünün nuruna yağış yağdırır*

*Yetimlərin fəryadına çatan, dul qadınların pənahıdır.*

*Bu, Əbu Talibin sözüdür.* [9]

İbn Həcər Əsqəlani "Səhih Buxari"nin şərhi olan "Fəthul-bari" kitabında deyir:

**"Əbu Talib bu sözlərlə Əbdülmüttəlibin zamanında baş vermiş hadisəyə işarə edirdi. O, Qüreyş üçün Allahdan yağış yağdırmasını diləmişdir. Peyğəmbər (səlləllahu aleyhi və alihi və səlləm) hələ uşaq idi. Ola bilər ki, Əbu Talib bunun peyğəmbərin vasitəslə ola biləcəyini bildiyi üçün bu sözlərlə o həzrəti mədh etmişdir".**

Həmçinin o, demişdir: **"Əbu Talibin Rəsulullahın (səlləllahu aleyhi və alihi və səlləm) peyğəmbərliyini tanıması barədə çoxlu rəvayətlər vardır.** [10]

**Yeddinci:**

İbn Əbilhədid Mötəzili belə nəql edir:

---

[8] Diyarbəkiri, "Tarixul-xəmis", c. 1, səh. 254. (Beyrut).

[9] "Səhihul-Buxari", "Kitabul-istisqa", bab: "sualun-nas əı-imamə əl-istisqa iza quhitu".

[10] "Fəthul-bari fi şərhi Səhihul-Buxari", "Kitabul-istisqa", bab: "sualun-nas əı-imamə əl-istisqa iza qəhətu".

*“Abbasi xəlifəsi Məmun belə deyərdi: “Əbu Talib dediyi bu sözlərə görə müsəlman idi.*

*Rəsula kömək etdim, o, Məlikin (Allahın adı) elçisidir*
*Şimşək parıltısı kimi parlayan qılıncla (və ya ləl-cavahiratla)*

*Allahın elçisini himayə və müdafiə edərəm*
*Qayğıkeş, ürəyiyanan bir himayəçi kimi.*

Bundan başqa Əbu Talibə nisbət verilən çoxlu sayda şeirlər vardır. Bu haqda məlumat əldə etmək istəyən Şeyx Əmininin “əl-Ğədir” əsəri, c. 7, səh. 330-336-ya baxa bilər.

## ÜÇÜNCÜ DƏLİL

Rəvayətlərdə qeyd olunur ki, Qüreyş əyanları bəzi səfehlərə Peyğəmbər (səlləllahu aleyhi və alihi və səlləm) namazda ruku edərkən onun üzərinə dəvə içalatı atmalarını tapşırdılar. Onlar da belə etdilər. Bu xəbər Əbu Talibə çatanda qəzəbli halda qulları ilə birlikdə gəldi. Peyğəmbərin (səlləllahu aleyhi və alihi və səlləm) üstündən içalatın götürülməsini və üstünün yuyulmasını əmr etdi. Daha sonra isə içalatı götürüb bu işi edənlərin bığlarının üstündən dolayıb bağlamağı əmr etdi. Bunu Qüreyşin əyanları qarşısında etdi. Allaha and içdi ki, bu işi edən hər kəsə belə etdirəcək. Heç kim ona qarşı çıxa bilmədi. Beləliklə də Qüreyş əyanlarının əlaltılarını zəlil və xar elədi”.[11]

## DÖRDÜNCÜ DƏLİL

İbn Əsir “əl-Kamil fit-tarix” əsərində belə deyir**: “Əbu Talib Əliyə dedi: “Sənin ibadət elədiyin bu din necə dindir?” Əli dedi: “Ey ata, Allaha və Onun peyğəmbərinə iman gətirdim, onunla birlikdə namaz qıldım”. Əbu Talib dedi: “Ona gəlincə, o, bizi yalnız xeyirə dəvət edər. Ondan ayrılma!”[12]**

---

[11] Şeyx Mufid, “Əbu Talibin imanı”, səh. 22.
[12] “əl-Kamil fit-tarix”, c. 2, səh. 38.

## BEŞİNCİ DƏLİL

Tarixçi İbn Əsir belə yazır:

**“Əbu Talib Peyğəmbərlə (səlləllahu aleyhi və alihi və səlləm) Əlinin namaz qıldığını gördü. Əli onun sağ tərəfində idi. Cəfərə (Allah ondan razı olsun) dedi: “Əmin oğlunun yanında dur və onun sol tərəfində namaz qıl”. Cəfərin İslamı qəbul etməsi Əlidən sonra olmuşdu”.[13]**

## ALTINCI DƏLİL

Qurtubi təfsirində yazır:

**“Bir gün Peyğəmbər (səlləllahu aleyhi və alihi və səlləm) Kəbəyə gəlmişdi. Namaz qılmaq istəyirdi. Namaza başlayanda Əbu Cəhl dedi: “Kim bunun namazını poza bilər?!” İbn Zibəri yerindən qalxıb dəvə bağırsağı götürüb Peyğəmbərin (səlləllahu aleyhi və alihi və səlləm) üzünü bulaşdırdı. Peyğəmbər (səlləllahu aleyhi və alihi və səlləm) namazdan çəkildi. Sonra əmisi Əbu Talib gəldi. Peyğəmbər (səlləllahu aleyhi və alihi və səlləm) ona dedi: “Ey əmi, görürsənmi mənə nə etdilər?”. Əbu Talib dedi: “Səni kim bu hala salıb?” Peyğəmbər (səlləllahu aleyhi və alihi və səlləm) dedi: “Abdullah bin Zibəri”. Əbu Talib qılıncını sıyırıb onun boynuna qoyub onu Qüreyşlilərin yanına gətirdi. Onlar Əbu Talibin gəldiyini görüb yerlərindən qalxdılar. Əbu Talib dedi: “Allaha and olsun ki, kim yerindən qalxsa qılıncımla onu qanına qəltan edərəm”. Hamı yerinə oturdu. Əbu Talib onlara yaxınlaşdı və (Peyğəmbərə) dedi: “Ey oğlum, səni kim bu hala saldı?”**

**Peyğəmbər (səlləllahu aleyhi və alihi və səlləm) dedi: “Abdullah bin Zibəri”. Əbu Talib bağırsağı götürüb onların sifətlərinə, saqqallarına, libaslarına bulaşdırdı və onları təhqir etdi”.[14]**

---

[13] İbn Əsir əl-Cəzəri, “Usdul-ğabə fi mərifətis-səhabə”, c. 1, səh. 542.
[14] Qurtubi, “əl-Came li-əhkamil-Quran”, c. 6, səh. 405, 406. Ənam surəsi, 26-cı ayənin təfsiri.

Əziz oxucu, Allah-taala Kitabında buyurur:

**“Məgər (O) səni yetim ikən tapıb, sığınacaq və pənah vermədimi?!”**[15]

Peyğəmbərə (səlləllahu aleyhi və alihi və səlləm) sığınacaq verən, onu tərbiyə və himayə edən əmisi Əbu Talib olmuşdu. Hətta Peyğəmbər (səlləllahu aleyhi və alihi və səlləm) onun üçün öz övladlarından da sevimli idi.

## YEDDİNCİ DƏLİL

Vaqidi “ət-Təbəqatul-kubra” kitabında yazır:

**“Rəsulullah (səlləllahu aleyhi və alihi və səlləm) itmişdi. Əbu Talib və əmiləri onun evinə gəldilər, lakin onu evdə tapmadılar. Əbu Talib Bəni-Haşim və Əbdülmüttəlib övladlarını bir yerə toplayıb dedi: “Hər biriniz iti qılınc götürüb mənim dalımca gəlin. Elə ki, mən Məscidul-hərəmə daxil oldum, hər bir gənc bir Qüreyş ağsaqqalının yanında otursun. İbn Hənzəliyyə də - yəni, Əbu Cəhl - onların içindədir. Əgər Muhəmməd qətlə yetirilibsə, o, bu şər işdən uzaq olmaz”. Gənclər dedilər: “(Nə əmr etsən) yerinə yetirərik”.**

**Zeyd bin Harisə gəlib çıxdı və Əbu Talibi bu halda gördü. Əbu Talib dedi: “Qardaşım oğlumu görmüsənmi?” Zeyd: “Bəli. Bir az bundan qabaq bir yerdə idik”. Əbu Talib dedi: “Onu görməmiş evimə girmərəm”. Zeyd tez Peyğəmbəri (səlləllahu aleyhi və alihi və səlləm) çağırmağa getdi. O həzrət Səfa dağının yanında bir evdə səhabələri ilə söhbət edirdi. Zeyd ona xəbər verdi. Rəsulullah (səlləllahu aleyhi və alihi və səlləm) Əbu Talibin yanına gəldi. Əbu Talib dedi: “Ey qardaş oğlu, harda idin? Xeyirli bir işdə idinmi?” Rəsulullah (səlləllahu aleyhi və alihi və səlləm) dedi: “Bəli”. Əbu Talib dedi: “Evinə get”. Rəsulullah (səlləllahu aleyhi və alihi və səlləm) evinə daxi oldu. Ertəsi günü Əbu Talib Peyğəmbərin (səlləllahu aleyhi və alihi və səlləm) evinə gəlib onun əlindən tutub Qüreyşin toplandığı yerə gətirdi. Onunla birgə Əbdülmüttəlib nəslindən olan gənclər də var idi. Əbu Talib dedi: “Ey Qüreyş camaatı, bilirsiniz nə qərara gəlmişdim?” Onlar:**

[15] Zuha surəsi, ayə 6.

**“Yox” - deyə cavab verdilər. Onlara bu barədə xəbər verdi. Sonra gənclərə “Əlinizdəkilər göstərin” - dedi. Onlar əllərindəkiləri göstərdilər. Hər birinin əlində iti qılınc vardı. Sonra Əbu Talib dedi: “Allaha and olsun ki, əgər onu qətlə yetirsəydiniz bizim hər birimiz ölənədək sizdən heç kim sağ qalmayacaqdı”. Qüreyşlilər xar oldular. Ən çox xar olan isə Əbu Cəhl oldu”.**[16]

## SƏKKİZİNCİ DƏLİL

Şəblənci “Nurul-əbsar” kitabında yazır:

**“Əli (Allah ondan razı olsun) dedi: “Əbu Talib vəfat edəndə Rəsulullaha (səlləllahu aleyhi və alihi və səlləm) onun vəfatı barədə xəbər verdim. Ağladı, sonra isə dedi: “Get onu yu, kəfənlə və dəfn elə. Allah onu bağışlasın və ona rəhm eləsin”. Onun dediklərini elədim. Rəsulullah (səlləllahu aleyhi və alihi və səlləm) günlərlə evindən bayıra çıxmayıb onun üçün istiğfar (bağışlanmasını) diləyirdi”. O (Şəblənci), həmçinin, adıçəkilən kitabında deyir: “Bu şeir Əbu Talibindir.**

**Bildim ki, Muhəmmədin dini**
**İnsanların ən xeyirli dinidir.**[17]

Ey insaflı oxucu, səndən soruşuruq. Müsəlman bir şəxs – İmam Əli (əleyhissalam) – Allah-taalaya şərik qoşan (bu sözdən Allaha pənah aparırıq) bir insana necə qüsl verib, onu kəfənləyib dəfn edə bilər?!

## DOQQUZUNCU DƏLİL

Şeyx Mufid – Allah ondan razı olsun – belə (məzmun olaraq) deyir:

**“Əbu Talib sağ olduqca Rəsulullah (səlləllahu aleyhi və alihi və səlləm) izzətli idi. Allah-taala onu əbədiyyətə qovuşdurana qədər Peyğəmbərə (səlləllahu aleyhi və alihi və səlləm) heç bir əziyyət verilmirdi. Cəbrayıl (əleyhissalam) Peyğəmbərə**

[16] İbn Səd əl-Vaqidi, “ət-Təbəqatul-kubra”, c. 1, səh. 135.
[17] Şəblənci, “Nurul-əbsar”, səh. 27,28.

**(səlləllahu aleyhi və alihi və səlləm) gəlib dedi: “Allah-taala sənə salam deyir və buyurur ki, Məkkədən çıx! Artıq sənin yardımçın vəfat edib”.**[18]

**ONUNCU DƏLİL**

Əmirəlmöminin İmam Əlinin (əleyhissalam) anası Fatimə binti Əsəd ilk müsəlman qadınlardan hesab olunur. Peyğəmbər (səlləllahu aleyhi və alihi və səlləm) ömrü boyu ona qarşı qayğıkeş olan bu möhtərəm müsəlman qadınla əmisi Əbu Talib arasında vəfat etdikdən sonra mərasim təşkil olunması, dəfn edilməsi, hüzn və əzadarlıq baxımından heç bir fərq qoymamışdı. Ancaq bəziləri Əbu Talibin müşrik olaraq vəfat etdiyini iddia edirlər. Halbuki bu, onların həqiqətən də, müsəlman, mömin və müvəhhid olduqlarına açıq-aşkar dəlalət edir.

**ON BİRİNCİ DƏLİL**

Şeyx Müfid deyir: **“Əbu Talib – Allah ona rəhm eləsin – vəfat edəndə İmam Əli (əleyhissalam) Rəsulullahın (səlləllahu aleyhi və alihi və səlləm) yanına gəlib onun vəfatını xəbər verdi. Rəsulullah bu xəbəri eşidəndə çox acı çəkdi və buyurdu: “Ey Əli, onun qüslünü ver, hənutla və kəfənlə. Elə ki, onu taxtın üstünə qoydun mənə xəbər ver. Əmirəlmöminin (əleyhissalam) bu əməlləri edib onun cənazəsini taxtın üstünə qoyduqdan sonra Peyğəmbər (səlləllahu aleyhi və alihi və səlləm) onun nəşinə yaxınlaşıb kövrələrək buyurdu: “Sileyi-rəhm etdin və ən gözəl mükafat aldın. Kiçik ikən məni böyüdüb himayə etdin, böyüdükdə isə arxa-dayaq çıxıb kömək etdin”. Sonra insanların qarşısına çıxıb buyurdu: “Allaha and olsun (qiyamət günü) əmimə elə şəfaət edəcəm ki, cinlər və insanlar təəccüblənəcək”.**[19]

Əziz oxucu, Peyğəmbərin (səlləllahu aleyhi və alihi və səlləm) əmisi üçün xeyirli dua etdiyini və qiyamət günü ona xüsusi şəfaət verəcəyi barədə buyurduğunu

[18] Şeyx Mufid, “İmanu Əbu Talib”, səh. 24.
[19] Şeyx Müfid, “İmanu Əbu Talib” səh. 25,26.

oxudun. Əgər o həzrətin əmisi müşrik və ya kafir olsaydı, Peyğəmbər onun üçün dua etməz, onun nəşi önündə dayanıb əmisinə və himayədarına qarşı duyğularını ifadə edən həmin sözləri deməzdi.

## ON İKİNCİ DƏLİL

Şafei məzhəbindən olan Şəblənci "Nurul-əbsar" adlı kitabında deyir: **"Peyğəmbərliyin onuncu ilində Xədiceyi-kubra (Allah ondan razı olsun) vəfat etmişdir. Həmin ili Peyğəmbər (səlləllahu aleyhi və alihi və səlləm) üçün iki ardıcıl müsibət baş vermişdi; əmisi Əbu Talibin və Xədicənin (Allah ondan razı olsun) vəfatı.**[20]

Şeyx Muhəmməd Səbban deyir:

**"Həmin il (Əbu Talib və Xədicənin vəfat ili) hüzn ili adlandı. Əbu Talib vəfat etdikdən sonra Qüreyş camaatı o sağ ikən Peyğəmbərə edə bilmədikləri (səlləllahu aleyhi və alihi və səlləm) əziyyətlər verməyə başladılar".**[21]

İbn Əsir əl-Cəzəri "əl-Kamil fit-tarix" əsərində deyir:

**"Onların hər ikisi vəfat etdikdən sonra Peyğəmbərin müsibəti daha böyük oldu. Rəsulullah (səlləllahu aleyhi və alihi və səlləm) buyurdu: "Əbu Talib vəfat edənədək Qüreyş mənə xoşlamadığım bir şey edə bilmədi". Çünki Qüreyş Əbu Talibin vəfatından sonra Peyğəmbərə o sağ ikən edə bilmədikləri əziyyətlər verməyə başladılar. Hətta bəziləri onun (Rəsulullahın) başına torpaq tökürdü".**[22]

Əgər Əbu Talib qəlbləri ədavətlə dolu olan bəzi insanların iddia etdikləri kimi müşrik olsaydı, necə ola bilər ki, Peyğəmbər (səlləllahu aleyhi və alihi və səlləm) onun vəfatına o qədər hüzünlənsin və həmin ili hüzn ili adlandırsın? Ola bilər ki, bəzi şeytan xislətli və ya sadəlövh avam insanlar Peyğəmbərin himayədarını itirdiyi üçün hüznləndiyini desinlər. Biz onlara cavab olaraq deyirik ki, bütün bunlar müşrik himayəçi üçün ola bilməzdi. Çünki müşriklər hələ də İslama və islamın peyğəmbərinə

---

[20] Şəblənci, "Nurul-əbsar", səh. 28.
[21] "Risalətus-Səbban fi əhli-beyt" səh. 21.
[22] İbn Əsir, "əl-Kamil fit-tarix", c. 2, səh. 63.

qarşı düşmənçilik edirdilər. Allah-taala buyurur: **“Şübhəsiz, insanların iman gətirənlərə qarşı düşmənçilikdə ən qatısının yəhudilər və müşriklər olmasını görəcəksən...”**[23]

## ON ÜÇÜNCÜ DƏLİL

Vaqidinin “ət-Təbəqatul-kubra” kitabında yazılır:

**“Əbu Talib ölüm ayağında olanda Əbdülmüttəlib övladlarını çağırtdırıb onlara dedi: “Muhəmmədi dinlədiyiniz və onun əmrinə tabe olduğunuz müddətdə xeyirdə olacaqsınız. Ona tabe olun, ona yardım edin ki, doğru yolda olasınız”.**[24]

## ON DÖRDÜNCÜ DƏLİL

İbn Kəsir “əl-Bidayə vən-nihayə” kitabında yazır:

**“Müşriklər müsəlmanlara qarşı əvvəl olduğundan daha çox sərt davranmağa başladılar. Müsəlmanları qətlə yetirirdilər. Bəla və müsibətləri çox şiddətli idi. Qüreyş camaatı belə qərara gəlmişdilər ki, Peyğəmbəri (səlləllahu aleyhi və alihi və səlləm) aşkarcasına qətlə yetirsinlər. Əbu Talib onların törətdikləri əməlləri gördükdə bütün Əbdülmüttəlib övladlarını bir yerə yığıb onlara tapşırdı ki, Peyğəmbərlə (səlləllahu aleyhi və alihi və səlləm) birlikdə onlara məxsus dərədə məskunlaşsınlar və bununla da Peyğəmbəri öldürmək istəyənlərə mane olsunlar. Qüreyş qəbiləsi xəbər tutanda ki, onlar Peyğəmbərə (səlləllahu aleyhi və alihi və səlləm) bir şey olmaması üçün cəm olublar, müşriklər bir araya gəlib belə qərara gəldilər ki, Peyğəmbəri (səlləllahu aleyhi və alihi və səlləm) öldürmək üçün onlara təslim etməsələr bir daha onlarla (Əbdülmüttəlib**

[23] əl-Maidə surəsi, ayə 82.
[24] “əl-Kamil fit-tarix” c. 1, səh. 78.

**övladları ilə) bir məclisdə olmayacaq, onlarla alış-veriş etməyəcək və onların evinə getməyəcəklər.**[25]

İbn Əsir yazdığı tarix kitabında deyir:

**"Qüreyş belə etdikdə Bəni-Haşim və Əbdülmüttəlib övladları Əbu Taliblə birlikdə ona məxsus dərəyə toplaşdılar. Bəni-Haşimdən yalnız Əbu Ləhəb bin Əbdülmüttəlib Qüreyşə qoşuldu... Onlar orada iki və ya üç il qaldılar. Bu illər ərzində çox şeydən məhrum qaldılar. Onlara yalnız gizli olaraq bir şey çatırdı".**[26]

Əziz oxucu, səni Allaha and verirəm, bunu oxuduqdan sonra hər hansı izaha ehtiyac duyulurmu? Səndə Bətha şeyxinin (Əbu Talib) iman gətirməsinə dair şəkk-şübhə varmı?

Onlar Əbu Talib barəsində ən azı onun Peyğəmbərlə (səlləllahu aleyhi və alihi və səlləm) birlikdə üç il məhrumiyyət içində dərədə bir yerdə olduğunu deyirlər. Hətta sonradan həmin dərə onun adı ilə "Şibu Əbi Talib" (Əbu Talibin dərəsi) adlandırıldı.

İndi özündən soruş və cavab verərkən də insaflı ol! Əbu Talib Peyğəmbərin dinində idi, yoxsa əhli-sünnənin iddia etdiyi kimi Qüreyşin dinində idi? Kim bütün bu müsibətlərə dözər, üç il boyu müşriklərin əziyyətinə səbr edər? Onun müşrik və ya Qüreyşin dinində olması ağlasığan bir məsələdirmi?

Şübhəsiz ki, o, Peyğəmbərin (səlləllahu aleyhi və alihi və səlləm) dininə iman gətirmişdi.

## ON BEŞİNCİ DƏLİL

İbn Səd əl-Bəsri Qüreyşin Peyğəmbəri (səlləllahu aleyhi və alihi və səlləm) və Bəni-Haşimi dərədə mühasirədə saxlaması barədə belə yazır:

**"Əbu Talib Qüreyş kafirlərinə dedi: "Qardaşım oğlu heç vaxt mənə yalan deməyib. O, mənə xəbər verdi ki, Allah-taala sizin səhifənizə (müsəlmanların və Bəni-Haşim övladlarının blokadada saxlanılması barədə yazılmış və Kəbədən asılmış əhdnamə) qarışqaları müsəllət etmiş və orada yazılan hər bir zülm, sitəm**

[25] İbn Kəsir, "əl-Bidayə vən-nihayə", c. 3, səh. 84.
[26] "əl-Kamil fit-tarix", c. 2, səh. 59, 60.

**və ya qohumluq əlaqələrinin kəsilməsi barədə olan bütün sözləri yemişdir. Orada yalnız Allahı xatırladan sözlər qalıb. Əgər qardaşım oğlu düz deyirsə, bu mənfur qərarınızdan çəkinməlisiniz. Əgər yalan demiş olsa, onu sizə təslim edərəm. İstər öldürər, istərsə də qul edərsiniz”.**

**Müşriklər dedilər: “Sən ədalətli söz dedin”. Səhifəni gətirmək üçün adam göndərdilər. Səhifəni açanda Rəsulullahın (səlləllahu aleyhi və alihi və səlləm) dediyi kimi olduğunu gördülər. Səhifə əllərindən yerə düşdü və başlarını aşağı saldılar”. Əbu Talib dedi: “Artıq nəyə görə həbs olunub mühasirədə qalmalıyıq?”**[27]

Diqqət et ki, Əbu Talib Qüreyş müşriklərinə “Qardaşım oğlu heç vaxt mənə yalan deməyib” dedikdə, Rəsulullaha (səlləllahu aleyhi və alihi və səlləm) nə qədər inanmış və onu təsdiqləmişdir. Görəsən bu səhifə barədə Peyğəmbərin sözünün doğruluğunu təsdiqəyən kəs necə ola bilər ki, onun dinini təsdiqləyib ona tabe olmasın?!

İndi gəl İbn Hişamın “Sirə”sində yazılanı birlikdə oxuyaq: **“Qüreyş Əbu Talibin Peyğəmbəri (səlləllahu aleyhi və alihi və səlləm), onun dinini qoruduğunu və onlara qarşı müsəlmanları ətrafına topladığını başa düşdükdən sonra Əmarə bin Vəlid bin Muğirəni götürüb onun yanına gəldilər. Sonra dedilər: “Ey Əbu Talib, bu, Əmarə ibn Vəliddir. O, Qüreyşdə ən güclü və ən gözəl oğlandır. Götür, onu sənə veririk. Onu özün üçün övlad elə. Qəbilən arasında təfriqə salan, yuxularını pozan qardaşın oğlunu bizə ver ki, onu öldürək. Bu, bir adam əvəzinə bir adam vermək (sövdəsidir)”. Əbu Talib dedi: “Allaha and olsun ki, mənimlə çox pis sövdələşirsiniz. Övladınızı mənə verirsiniz ki, onu yedizdirib içizdirim, mən də övladımı sizə verim ki, onu öldürəsiniz? Allaha and olsun ki, bu heç vaxt olmayacaq!”**[28]

Bəthanın ağasının son cümləsinə diqqət et!

*“Övladınızı mənə verirsiniz ki, onu yedizdirib içizdirim, mən də övladımı sizə verim ki, onu öldürəsiniz? Allaha and olsun ki, bu heç vaxt olmayacaq!”* Halbuki səhifə məsələsində Əbu Talibin Qüreyş müşriklərinə dediyi sözləri oxuduq. Belə ki, orada

---

[27] İbn Səd, “ət-Təbəqatul-kubra”, c. 1, səh. 142, 143.
[28] “Sirətu İbn Hişam”,c. 1, səh. 240, 241.

belə demişdi: *“...Allah-taala sizin səhifənizə (müsəlmanların və Bəni-Haşim övladlarının blokadada saxlanılması barədə yazılmış və Kəbədən asılmış əhdnamə) qarışqaları müsəllət etmiş... Əgər qardaşım oğlu düz deyirsə, bu mənfur qərarınızdan çəkinməlisiniz. Əgər yalan demiş olsa, onu sizə təslim edərəm. İstər öldürər, istərsə də qul edərsiniz”*. Əziz oxucu, səni Allaha and verirəm! İbn Hişamın qeyd etdiyi kimi necə ola bilər ki, Əbu Talib Peyğəmbəri müşriklərə təslim verməyi rədd edir, amma səhifə məsələsində əgər yalan desə onu müşriklərə verəcəyini tam əminliklə söyləyir.

Bu, Əbu Talibin Peyğəmbərin dediyi hər şeyi təsdiqləməsi və onun dininə iman gətirməsinə dəlalət etmirmi?

## ON ALTINCI DƏLİL

İbn Əbdulbirr əl-Qurtubinin “əl-İstiab fi mərifətil-əshab” kitabında Əqil ibn Əbu Talibin tərcümeyi-halında yazıb: **“Peyğəmbər (səlləllahu aleyhi və alihi və səlləm) ona dedi: “Ey Əbu Yəzid, mən səni iki məhəbbətlə sevirəm: Mənimlə qohum olmağına və əmimin səni sevdiyini bildiyim üçün.**[29]

Bu hədis açıq-aşkar dəlalət edir ki, Peyğəmbər (səlləllahu aleyhi və alihi və səlləm) Əqili iki məhəbbətə sevirdi:

**Birinci:** Əqil Peyğəmbərin əmisi oğludur, eyni nəsildən və qandandırlar.

**İkincisi:** Çünki Əbu Talib Əqili çox sevirdi.

Peyğəmbər (səlləllahu aleyhi və alihi və səlləm) əmisi Əbu Talibi sevdiyi üçün qohumluq sevgisi ilə əmisinin özünəməxsus sevgisini bir yerdə cəm etmişdir. Bu ona dəlalət etmirmi ki, Peyğəmbər əmisi Əbu Talibi sevdiyi üçün Əqili çox sevirdi? Əgər bəzilərinin iddia etdiyi kimi Əbu Talib müşrik olaraq vəfat etmişdirsə, necə ola blər ki, Peyğəmbər (səlləllahu aleyhi və alihi və səlləm) müşrik olaraq ölən əmisini hələ də sevsin?! Belə olarsa, Peyğəmbərin bu əməli onun şəninə layiq olmazdı. Çünki Allah-taala Qurani-kərimdə bir neçə ayədə bu əməli qadağan edir. Həmin ayələrdə Allah-taala buyurur:

[29] “əl-İstiab fi mərifətil-əshab”, c. 3, səh. 186.

**“Ey iman gətirənlər, Mənim düşmənimi və öz düşməninizi dost tutmayın! Siz onlarla dostluq əlaqəsi yaradırsınız, halbuki onlar həqiqətən, Haqqın tərəfindən sizə gələnə kafir olmuşlar...”[30]**

**“De: «Allaha və Onun peyğəmbərinə itaət edin». Beləliklə, əgər arxa çevirsələr, onda (bilsinlər ki,) həqiqətən Allah kafirləri sevmir.”[31]**

**“Ey iman gətirənlər, əgər atalarınız və qardaşlarınız küfrü imandan üstün tutsalar, onları özünüzə dost və köməkçi götürməyin. Sizdən kim onları dost və köməkçi götürsə, (dostluğu öz lazımi yerində sərf etmədikləri üçün) onlar həmin zalımlardır.”[32]**

Peyğəmbərin (səlləllahu aleyhi və alihi və səlləm) əmisi Əbu Talibə olan məhəbbəti ilə müşriki sevməyi qadağan edən bu ayələr arasında necə uyğunluq ola bilər?

**Cavab:** Bunun yalnız bir həll yolu var. Əbu Talib bəzilərinin iddia etdiyi kimi müşrik deyil, mömin olmuşdur.

## ON YEDDİNCİ DƏLİL

“Səhih Buxari”nin “Cihad və seyr” fəslində müşriklərə dua etmək babında belə nəql olunur: **“Əbu Hureyrə belə nəql edir: “Tufeyl bin Əmr əd-Dausi və yoldaşları Peyğəmbərin (səlləllahu aleyhi və alihi və səlləm) yanına gəlib dedilər: “Ya Rəsulullah, Daus qəbiləsi itaətsizlik edir. Onlar üçün Allahdan bəddua elə”. Camaat: “Daus artıq həlak oldu!” - dedilər. Rəsulullah (səlləllahu aleyhi və alihi və səlləm) buyurdu: “İlahi, Daus qəbiləsini hidayət elə və onları yola gətir!”[33]**

Diqqət et! Tufeyl Peyğəmbərdən Daus qəbiləsinə qarşı dua etməsini istəyir. Çünki onlar İslamı qəbul etmək istəmirdilər. Oxuyuruq ki, Peyğəmbər (səlləllahu aleyhi və alihi və səlləm) Tufeylin istəyinə qarşı çıxaraq Daus qəbiləsinin əleyhinə deyil, xeyrinə

[30] Mumtəhənə surəsi, ayə 1.
[31] Ali İmran surəsi, ayə 32.
[32] Tövbə surəsi, ayə 23.
[33] Bu hədis “Səhih Buxari”də təkrar olaraq “Kitabul-məğazi”, bab “qissətu Daus” bölməsində qeyd edilmişdi.

dua elədi. Bu, onun bəşəriyyətə qarşı olan şəfqət və mərhəmətindən irəli gəlirdi. Bilirik ki, Peyğəmbərlə Daus qəbiləsi arasında heç bir qohumluq əlaqələri də yoxdur. Həmçinin bilirik ki, Peyğəmbərin (səlləllahu aleyhi və alihi və səlləm) duası müstəcabdır və yeddi qat hicabı keçər. O həzrətin bu duası sayəsində Daus qəbiləsi İslam dinin qəbul elədi. Tarix bunu bizə bəyan edir.

Diqqət etmək lazımdır ki, Əbu Talib qohumluq və məsafə baxımından Peyğəmbərə yaxın idi. Bundan əlavə, Peyğəmbər əmisinin bu dini qəbul etməsini istəyir və arzulayırdı. Allah-taala şanlı kitabında buyurur:

**“Ey iman gətirənlər, özünüzü və ailənizi yanacağı insanlardan və daşlardan ibarət olan oddan qoruyun...”**[34]

Əbu Talibin Peyğəmbərin (səlləllahu aleyhi və alihi və səlləm) qohumu və ailəsi olması aydındır. Görəsən Peyğəmbər əmisini dinə dəvət etməkdə laqeydlikmi edib? Peyğəmbərin uzaq Daus qəbiləsi üçün dua etməsilə yanaşı qohumluq və məsafədə ona yaxın olan Əbu Talibə qarşı laqeydlik etməsini necə başa düşək?! Əgər tarixdə oxuduqlarımız haqdırsa, mən soruşuram:

“Ya Rəsulullah, bu ədalətdəndir?! Sən Daus qəbiləsinin İslamı qəbul etmələri və hidayət olmaları üçün dua edirsən, amma əmin Əbu Talib üçün dua etmirsən!

Səni himayə edən, sənə sığınacaq verən, tərbiyə edən, qoruyan və daima səni müdafiə edən Ədu Talibi! Düşmən də, dost da, onun bu məziyyətinə şahiddir.

Biz sənin barəndə belə düşünmürük, ya Rəsulullah!

Həmçinin Əbu Talib tək insan idi. Onun İslamı qəbul etməsi çox asan idi. Bu sənin duan ilə olacaqdı! Həmçinin dəvəti qəbul etməyə hazır idi. Daus qəbiləsinə gəlincə, onlar minlərlə insandan ibarət idi. Mədinədən Yəmənə kimi uzaq bir məsafədən dua etməklə onların İslam dinini qəbul etmələrinə nail olan Peyğəmbər necə ola bilər ki, əmisi üçün dua etməsin?! Əmisinə İslamı qəbul etdirməyi bacarmırdımı?”

## Bir hədis və onun izahı

[34] ət-Təhrim surəsi, ayə 6.

Müslim öz “Səhih”ində belə nəql edir:

**... Əbdülməlik bin Ümeyrdən ... Abbas bin Əbdülmüttəlib Peyğəmbərə belə dediyini nəql edir: “Ya Rəsulullah, Əbu Talib bir fayda gördümü? O, səni qoruyur və sənin uğrunda qəzəblənirdi?” Peyğəmbər buyurdu: “O, az miqdarda olan cəhənnəm odunun içindədir. Əgər mən olmasaydım, o, cəhənnəm odunun ən aşağı qatında olardı”.**[35]

Bu hədisin ravilərindən biri Əbdülməlik bin Ümeyrdir. Hicrətin 327-ci ildə vəfat etmiş İbn Munzir ər-Razi hədis ravilərinin tənqidinə dair kitabında belə yazır:

*“Əbdülməlik bin Ümeyr hədisi hifz etməldə səciyyələndirilmir. Hədis alimləri onun barəsində müxtəlif sözlər deyiblər”.*

*“Əbdülməlik bin Ümeyr qarışdırandır, hədis hafizi deyil. Ölmədən öncə onun hafizəsi dəyişdi”.*

Əhməd bin Hənbəl onun haqqında deyir: *“Əbdülməlik bin Ümeyr dəqiq deyil”.*[36]

Başqa bir yerdə isə belə deyir:

*“Əbdülməlik bin Ümeyr az rəvayət etməklə yanaşı hədis nəql etməkdə də dəqiq deyil”.*

*Yəhya bin Muin onun barəsində deyir: “Qarışdırır”.*

*Əbu Hatəm deyir: “Hədis hifz edən deyil... Ölmədən öncə hafizəsi dəyişmişdir... Hədis hifz etmək xüsusiyyəti ilə vəsf olunmayıb”.*[37]

“Səhih Buxari”də “Kitabul-cənaiz”, bab “izə qaləl- muşrik indəl-movti la ilahə illəllah” (“Cənazələr” bölməsi, “müşrik ölərkən la ilahə illəllah deyərsə” babı) bölməsində yazılıb:

İbn Şihab belə nəql edir ki, Səid bin Müseyyib atasının ona belə xəbər verdiyini deyir: **“Əbu Talib ölüm ayağında olanda Peyğəmbər (səlləllahu aleyhi və alihi və səlləm) onun yanına gəldi. Orada Əbu Cəhl bin Hişam, Abdullah bin Əbu Uməyyə bin Muğirəni də gördü. Rəsulullah (səlləllahu aleyhi və alihi və səlləm) Əbu**

---

[35] “Səhih Müslim”, “kitabul-iman”, bab “şəfaətun-nəbi”, c. 1, səh. 134.
[36] “əl-Cərh vət-tədil”, c. 5, səh. 360.
[37] Yusif əl-Mizzi, “Təhzibul-kamal”, c. 18, səh. 373, 375.

**Talibə dedi: “Ey əmi, la ilahə illəllah kəlməsini de, Allah yanında sənə şahid olum”. Əbu Cəhl və Abdullah bin Əbu Uməyyə dedilər: “Ey Əbu Talib, sən Əbdülmüttəlibin dinindən çıxamaq istəyirsən?”. Peyğəmbər (səlləllahu aleyhi və alihi və səlləm) hər dəfə ona şəhadət gətirməyi təklif etdikdə onlar eyni sözü dedilər. Sonda Əbu Talib la ilahə illəllah deməkdən imtina etdi və ən son sözü Əbdülmüttəlib dininə məxsus oldu. Peyğəmbər (səlləllahu aleyhi və alihi və səlləm) buyurdu: “Allah-təalaya and olsun ki, mənə qadağan olunmayanadək sənin bağışlanmağını diləyəcəm”. Bundan sonra Allah-taala bu ayəni nazil etdi:**

**“Peyğəmbərə və iman gətirənlərə müşriklərin Cəhənnəm əhli olduqları onlara bəlli olduqdan sonra onlar üçün, (hətta qohumlarından olsalar belə) bağışlanmaq istəmək yaraşmaz (və bu, şəriət baxımından caiz və ağıl baxımından düzgün olmaz).”[38]**

## “SƏHİH MÜSLİM” VƏ “SƏHİH BUXARİ”DƏ QEYD OLUNAN RƏVAYƏTLƏRƏ CAVAB

Möhtərəm şiə alimləri bu yalan və uydurmaların üstünü açmışlar. Böyük tədqiqatçı şeyx Əbdülhüseyn Əmini “əl-Ğədir” kitabında deyir:

**“Bu hədisin ravisi Səid bin Müseyyibdir. O, möminlərin əmiri Əliyə (əleyhissalam) düşmənçilik edənlərdən idi. Onun dediklərinə istinad edilməz”.** Həmçinin deyir: **“Peyğəmbərə və iman gətirənlərə müşriklərin Cəhənnəm əhli olduqları onlara bəlli olduqdan sonra onlar üçün, hətta qohumları(ndan) olsalar belə, bağışlanma istəmək yaraşmaz (və bu, şəriət baxımından caiz və ağıl baxımından düzgün olmaz)” ayəsi Əbu Talibin vəfatından bir neçə il, təqribən səkkiz il sonra Mədinədə nazil olmuşdu. Bu müddət ərzində Peyğəmbər (səlləllahu əleyhi və alihi və səlləm) “Allaha and olsun ki, mənə qadağan olunmayanadək sənin üçün bağışlanma diləyəcəm” sözünə əməl edərək Əbu Talib üçün istiğfar edirdimi?! (Ayə nazil olanadək) necə istiğfar edə bilərdi, halbuki**

[38] ət-Tövbə surəsi, ayə 113.

**möminlərə qadağan olunmuşdur ki, müşrik və münafiqlərə məhəbbət bəsləməsinlər? Onlar üçün istiğfar diləmək məhəbbətin ən bariz göstəricisidir.**[39]

Buna əlavə olaraq deyirəm:

Səid bin Müseyyibin əhli-beytdən əqidə baxımından uzaq düşməsi və azmasına sübut Vaqidinin "ət-Təbəqat" əsərində qeyd etdikləridir.

**Səid bin Müseyyib İmam Zeynulabidin Əli bin Hüseyn bin Əli bin Əbu Talibin cənazəsi yanından keçərkən onun üçün cənazə namazı qılmamışdı. Ona "Əhli-beytdən olan bu əməlisaleh insan üçün cənazə namazı qılmayacaqsan?" deyildikdə, belə cavab vermişdir: "Əməlisaleh bir adama cənazə namazı qılmaqdansa, iki rükət namaz qılmaq mənim üçün daha sevimlidir"**[40]

Mərhum fəqih seyid Muhəmməd Hüseyni Şirazi *"(Ya Peyğəmbər!) Şübhəsiz, sən özün istədiyin hər bir kəsi hidayət edə (doğru yola yönəldə) bilməzsən. Lakin Allah istədiyi hər bir kəsi hidayət edər (onu düz yola yönəldir) və O, doğru yola istedadı (qabiliyyəti) olanları daha yaxşı bilir"* ayəsinin təfsir və izahına belə deyir:

**"Ya Rəsulullah, sən istədiyini hidayət edə bilməzsən, yəni insanlar içərisində hidayət olunmasını istədiyini hidayət etməyi bacarmazsan. Peyğəmbər əmisi Əbu Ləhəbin və digər Qüreyş əyanlarının, hətta bütün insanların hidayət olunmasını arzulayırdı. Lakin o, bunu etmək iqtidarında deyildi. Burada hidayətdən məqsəd təkcə düz yolu göstərmək deyil, eyni zamanda onları İslamı qəbul etməyə vadar edəcək əməldir. Ayədə "Lakin Allah istədiyi hər bir kəsi hidayət edər" məsələsinə gəlincə, Allah iman gətirməyə hazır olan kəsə gizli lütf edər və onun ruhiyyəsini qəbul etməyə hazırlayar. Allah-taala və Peyğəmbər tərəfindən düz yolu göstərmək isə bütün insanlara eyni dərəcədə aiddir. Bu mübarək ayənin aid olduğu kəslərdən biri də "Fi zilali Quran" kitabının müəllifi, qəlbi iman nuru ilə hidayət olmayan Seyid Qütbdür. Onun qəlbi Peyğəmbərə, əhli-beytinə və qohumlarına qarşı kin-küdurətlə doludur. O, batil sözlərlə, Allahın və Onun Rəsulunun düşməni olan əməvilərə, Qurani-kərimdə lənətlənmiş ağacın budaqlarına kor-koranə təqlid edərək Peyğəmbəri, əmisini və digər qohumlarını**

[39] Əllamə Əmini, "əl-Ğədir", c. 8, səh. 9, 10.
[40] İbn Səd əl-Vaqidi, "ət-Təbəqatul-kubra", c. 3, səh. 426.

**təhqir etmişdir. Bu ayəni Əbu Talibə şamil etmək istəmişdir. Halbuki o, əhli-sünnə və şiə qaynaqlarında Əbu Talibin Peyğəmbərə (səlləllahu aleyhi və alihi və səlləm) ilk iman gətirənlərdən biri olduğunu oxumuşdur. Bu sözləri məhz Əbu Talib söyləmişdi:**

**Bildim ki, Muhəmmədin dini**
**İnsanların ən xeyirli dinidir.**

**Əgər Əbu Talib əhli-beytə düşmən olan bir şəxsin atası olsaydı, onu müqərrəb mələklərin məqamına ucaldardılar! Lakin onun təkcə bir günahı var! Çünki o, möminlərin əmiri imam Əlinin (əleyhissalam) atasıdır! Ata və övladı necə də hörmətli və yüksək məqama layiqdir!**

**Osmanı təmizə çıxarmaq üçün "Üz-gözünü turşutdu və arxasını çevirdi" ayəsini Peyğəmbərə aid edən kəs barəsində bundan başqa nə deyə bilərəm ki,.."[41]**

**Mövzunun xülasəsi**

Xülasə olaraq deyirik: Tarix kitabları sonrakı zamanlarda və zalım hakimlərin dövründə qələmə alınmışdır. Həmçinin hədislərin qələmə alınması da bu cürdür. Hakim dairələr müsəlmanlara İslam dinində dəyişikliklər etməyə və onların istəklərinə uyğun hədislər qələmə almağa məcbur etmişlər. Bəzi müəlliflər və mühəddislər hakimiyyəti razı salmaqdan ötrü aşırı dərəcədə təhrifə yol verirdilər. Bəziləri İmam Əliyə (əleyhissalam) həsəd apardıqlarına və qəlblərində bəslədikləri kin-küdurətə görə ona tənə vurmaqda aciz qalmışlar. Qəlblərində gizli qalan kin-küdurət və həsəd oxunu onun atasına yönəltmişlər. Bununla da sevdikləri xəlifə və hakimlərin ataları ilə İmam Əlinin (əleyhissalam) atası arasında bərabərlik yaratmağa çalışmışlar. Tarix bizə Ömər bin Xəttabın valideynlərinin müşrik olaraq öldüklərini deyir. Həmçinin, Osman bin Əfvanın valideynləri müşrik olaraq ölmüşlər. Adları çəkilən bu şəxslərin atalarının tarixdə nə İslamdan əvvəl, nə də sonra heç bir xatirəsi yoxdur. Heç kim bu barədə

[41] "Təqribul-Quran iləl-əzhan", c. 20, səh. 73.

mübahisə etmir. Düşmənlər İmam Əlidə (əleyhissalam) heç bir eyib tapa bilmədikdə zərbəni Əbu Talibə tərəf yönəltdilər.

Ötən səhifələrdə Əbu Talibin cəhənnəm odunda olması və ayaqlarının altındakı yanar kömürün təsirindən beyninin qaynaması – necə ki, bəzi hədislərində belə yazılır – barədə olan digər hədislərin yalançı və cəfəngiyat uyduranlar tərəfindən qondarıldığı sənə məlum oldu. Doğrusu mən Əbu Talibin beynini qaynadan ayağının altındakı yanar kömürün nə əhəmiyyət daşıdığını anlaya bilmirəm. Əgər o cəhənnəm odunun içindədirsə, ayağının altında olan yanar kömürün nə əhəmiyyəti var? Rəvayəti nəql edən şəxs kin-küdurətlə yanan qəlbini sərinləşdirməkdən ötrü özündən əvvəlki yalançının sözlərinə bunu əlavə emişdir. Allah-taala buyurur:

**“Və Allahı zalımların etdiklərindən əsla xəbərsiz sanma! (Allah) onlara əslində yalnız gözlərin (Məhşərin dəhşətindən) bərələcəyi gün üçün möhlət verir”.**[42]

Son olaraq deyirəm: “İndi Əbu Talibin iman gətirməsini sübut edən bütün qəti dəlilləri kənara ataq ? Səid bin Müseyyib və Əbdülməlik bin Ümeyr kimi yalançıların rəvayətlərini əsas hesab edək?! Əbu Talibin imanına ləkə yaxmaq istəyən və tənqid olunmağa daha çox layiq olan bəzi səhabələrin şənini ucaldan bu kimi insanların sözlərinə etibar edək?!”

Son duamız aləmlərin Rəbbi olan Allaha həmd olsun! Mürsəl peyğəmbərlərin ağasına və onun pak əhli-beytinə salam və salavat olsun!

**Bu mövzu barəsində daha artıq məlumat istəyənlər aşağıdakı mənbələrə müraciət edə bilər**

1. “Əbu Talib Qüreyşin mömini”, Abdullah Xuneyziri.
2. “İmanu Əbu Talib”, Şeyx Mufid. (vəfat tarixi hicri 413).
3. “əl-Huccə alə zahib ilə təkfiri Əbu Talib”, Seyid Əli bin Fəxar əl-Musəvi.
4. “Əsna mətalib fi nicati Əbu Talib”, Əhməd bin Zeyni bin Əhməd Dəhlan Şafei. (vəfat tarixi hicri 1304).

[42] İbrahim surəsi, ayə 42.

5. “Məvahibil-vahib fi fəzaili Əbu Talib”, Şeyx Cəfər ən-Nəqdi (vəfat tarixi hicri 1370).

6. “Şeyxul-əbtəh av Əbu Talib”, Seyid Muhəmməd Əli Alu Şərəfuddin əl-Amuli.

7. “Səfəhat min həyati seyyidina Əbu Talib”, Seyid Mustafa bin Muhəmməd Kazim əl-Qəzvini.